**Rüstəm Mehdi**

«İslamı yeni öyrənənlər üçün oruc fiqhi» — Elektron kitab: 1440. (2019)

Bu kitab oruc fiqhini olduqca rahat, tərtibli və asan şəkildə təqdim edir. Kitabda sadəcə real, zəruri mə'lumatlara yer verilməsi onun əzəmi dərəcədə, maksimum istifadəsinə yol açır.

## MÜQƏDDİMƏ

Bütün kainatın rəbbi olan Allaha sonsuz həmd-səna, onun pak elçisi Məhəmmədə, ailəsinə, əhli-beytinə, səhabələrinə və Qiyamət gününə qədər onların yolu ilə gedənlərə Allahın salamı, rəhməti və bərəkəti olsun.

Fiqh, başqa bir deyişlə şəriət insanın ibadətlərini və digər əməllərini düzəldən, onları Allahın muradına uyğun nizama salan elmdir. Oruc fiqhi də orucla əlaqəli şər'i hökmlərdən bəhs edir, onun doğru və keçərli olması üçün lazım olan qaydaları öyrədir.

Hər ramazan ayında insanların oruc fiqhinə yenidən müraciət etməsi danılmaz bir faktdır. Lakin təəssüflər olsun ki, azərbaycan dilində bu sahədə adi oxucunun asan şəkildə oxuyub qavraya biləcəyi bir əsər yoxdur. Mövcud ədəbiyyat ya başqa dillərdən, xüsusilə türk dilindən tərcümə edilmiş kitablar, ya da elə həmin kitabların tərcümə edilməmiş halıdır. Həmin kitablar isə bir məsələdə fərqli görüşlərin qeyd olunduğu, bir çox qaynaq əsərlərin adının keçdiyi əsərlər olduğundan sadə oxucunu çaş-baş sala bilir. Bu səbəbdən qısa və rahat qavranacaq bir kitabın yazılması labüd idi.

Kitab İslamı yeni öyrənənlər üçün nəzərdə tutulduğundan fiqhi məsələləri uzun-uzadı dəlilləri ilə əsaslandırmağı uyğun görmədim, çünki fiqh çətin bir sahədir və bu sahənin dəlillərini rahat anlamaq müəyyən səviyyədə mütaliə tələb edir. Məqsəd asan şəkildə başadüşülən bir kitab olduğundan sadəcə bə'zi məsələlərin ümumi dəlillərini qeyd etməklə kifayətləndim. Bundan əlavə bölümlərin sonunda o bölümü daha yaxşı şəkildə qavramağa yardım edəcək tətbiqatlar, suallar və tapşırıqlar qeyd etdim.

Fiqh kitablarında keçən tərtibə riayət etmədim, əksinə, özüm yeni oxucuların asan qavraması üçün tərtib və bölgülərdə bə'zi zəruri dəyişikliklər etdim. Çünki məqsəd insanlara asan şəkildə əməl edəcəkləri bir kitab yazmaqdır. Məqsəd hasil olduqdan sonra tərtib və bölgülərdə dəyişiklik etməkdə heç bir problem yoxdur.

Kitabda oruc fiqhiylə əlaqəli hər şeyi qeyd etmədim. Zəruri miqdar ramazan orucu olduğundan sadəcə bu orucla əlaqəli hökmləri və yasaq orucları qeyd etdim.

Bu kitabda fiqh kitablarında keçən, lakin bu gün İslamı yeni qəbul edən və yaxud yeni öyrənən birinin, xüsusilə Azərbaycanda yaşayan şəxslərin bilməməklə bir şey itirməyəcəyi mə'lumatları da qeyd etmədim.

Allah-Təaladan bu kiçik əməli ixlasla görülmüş işlər sırasına qatmasını və onu insanlar üçün faydalı etməsini diləyirəm. O, qullarına qarşı mərhəmətli və az əməl müqabilində çox savab verəndir. Hər xeyir işdə olduğu kimi bu işdə də müvəffəqiyyət Allahdandır.

Rüstəm Mehdi
30 rəcəb 1440
(6 aprel 2019)

## ORUCUN TƏ'RİFİ VƏ ƏHƏMIYYƏTİ

Oruc dan yeri söküləndən (sübh namazı girəndən) günəş tam şəkildə batıncaya qədər (məğrib namazı girincəyə qədər) qidalanmaqdan və cinsi həzdən uzaq durmaqdır. Qidalanmaqla qəsd edilən həm normal qidalanma, həm müalicə məqsədilə qidalanma, həm də qida sayılmasa da daxilə birşey ötürməkdir. Bu səbəbdən inşallah orucu pozan hallar bölümündə hər üç haldan bəhs edəcəyik.

Cinsi həzz dedikdə isə həm halal, həm haram olan cinsi əlaqə, həm də cinsi əlaqə olmadan (məs: masturbasiya) şəhvəti söndürmək qəsd edilir.

Oruc tutmağın əhəmiyyəti olduqca böyükdür. Bu səbəbdən bu ibadət bizdən əvvəlki ümmətlərə də fərz edilmişdir. Allah-Təala bu haqda belə buyurur: *«Ey iman edənlər, oruc tutmaq sizdən əvvəlki ümmətlərə fərz edildiyi kimi sizə də fərz edildi ki, Allahdan qorxub təqvalı olasınız.»* [əl-Bəqərə surəsi: 183]

Orucun faydaları çoxdur, bu faydalardan ən böyüyü Allah qorxusu, ona qarşı təqvalı olmaqdır. Az öncə qeyd etdiyimiz ayədən də göründüyü kimi, Allah-Təala orucun insanı təqvaya sövq edəcəyini buyurur. Təbii ki, bunun üçün gərək insan sadəcə ac və susuz qalmasın, həqiqi mə'nada, günahlardan uzaq duraraq oruc tutsun.

Orucun digər bir faydası yoxsulların halını yaşayaraq onların dərdini başa düşməkdir. Təbii ki, bir ay boyunca günün müəyyən vaxtında ac-susuz qalan insan bunun çətinliyini gördükdən sonra bütün il boyu bənzər vəziyyətdə yaşamağa məcbur olan insanları daha yaxşı anlayar. Bu səbəbdən gərək nə sahur nə də iftar[1] yeməkləri təntənəli və çox çeşidli olsun. Çünki bu hal yoxsulların halını başa düşməyə əngəl olan bir şeydir.

İnsanı dünya naz-ne'mətinə çox da bel bağlamamağa sövq etməsi də orucun faydaları arasındadır. Günün çox hissəsini bir çox naz-ne'mətdən uzaq keçirən bir insan -əgər niyyəti ixlaslı olarsa- nəfsini də tərbiyə etmiş sayılar. Ona görə dünyanın parıltısı nisbətən azalar, bər-bəzəyi dəyərini itirməyə başlar. Lakin bunun üçün gərək insan onu dünyaya bağlayacaq vəsilələrdən uzaqlaşsın. Misal üçün oruc tutumuş bir insan gününü televizor və kompyuter

[1] Sahur oruc tutarkən, iftar isə oruc açarkən yeyilən yeməkdir.

qabağında keçirərsə, orucu ona dünya bər-bəzəyini unutdura bilməz, çünki mə'dəsi ac-susuz qalsa da gözü və zehni dünya bər-bəzəyilə qidalanmış olar.

Orucun əsas faydalarından biri də insanın Allahın əmr-yasaqlarına qarşı itaətkar olmağa öyrəşməsidir. Təbii ki, dünya naz-ne'mətləri arasında insan övladının ən çətin tərk edəcəyi şey qida və qarşı cinsdir. Hətta bütün dünya bər-bəzəkləri, naz-ne'mətləri bu iki şeyi lüks şəkildə yaşamaq üçün əldə edilir. Əgər insan bir ay boyunca günün çox hissəsində sırf Allah əmr edib deyə bu iki şeydən uzaq durar və nəfsini buna öyrəşdirərsə, Allahın digər əmr və yasaqları qarşısında daha da itaətkar olar. Bunun baş verməsi üçün isə oruc tutarkən sırf Allahın əmri olduğu üçün tutmaq lazımdır. Əgər niyyətə pəhriz, sağlamlıq və s. kimi şeylər qarışarsa bu həm orucu keçərli etməz, həm də insanın ruhunu tərbiyə etməyə yetməz.

Bu qeyd etdiyimiz şeylərdən başqa orucun bir çox faydaları vardır. Lakin qəsdimiz müxtəsər bir kitab olduğundan bu qədərlə kifayətlənirik.

## ORUC KİMLƏRƏ FƏRZDİR?

Hər ibadət kimi orucun da fərz olması üçün insanın bə'zi şərtləri özündə cəm etməsi lazımdır. Bu şərtlər üçdür: 1) müsəlman olmaq, 2) həddi-büluğa çatmaq, 3) ağlı və huşu başında olmaq.

**Müsəlman olmaq.** Oruc bir ibadətdir. İbadətin qəbul olması üçün isə insanın müsəlman olması vacibdir. Bu səbəbdən oruc kafirlərə fərz deyil.

Əgər bir insan ramazan ayının ortasında müsəlman olarsa, o şəxsə həmin ramazanın qalan günlərinin orucu fərz olar. Kafir olduğu müddətdə tərk etdiyi orucları qəza etməsi isə ona vacib olmaz.

**Həddi-büluğa çatmaq.** Həddi-büluğ insanın yetkinlik dönəmidir. İslam qanunlarına görə insan həddi-büluğa çatmadan öncə əmr və yasaq qanunlarına yönəlik məs'uliyyət daşıması üçün kamil vəsflərə sahib sayılmır. Bu səbəbdən həddi-büluğa çatmayan birisinə oruc fərz deyil.

Həddi-büluğa çatmaq orqanizmdə baş verən bə'zi prosseslərlə bilinir. Oğlan xeylağı boşalmağa başladığı zaman artıq həddi-büluğa çatmış sayılır. Qızlarda isə bu məsələdəki ölçü heyz (aybaşı) halını yaşamağa başlamalarıdır. Bu prosseslər baş verdiyi zaman yaş neçə olur olsun, insan həddi-büluğa çatmış sayılır.

Əgər bu qeyd etdiyimiz təbii halların baş verməsi on beş yaşa qədər gecikərsə, bu yaşda həm oğlan həm də qız həddi-büluğ mərhələsinə çatmış sayılar.

Əgər insan ramazan ayının ortalarında həddi-büluğa çatarsa, ona ramazanın qalan günlərinin orucu fərz olar. Bundan öncə tərk etdiyi orucları qəza etməsi isə vacib olmaz. Lakin həmin şəxs həddi-büluğa çatmadan öncə oruc tutarsa o orucları keçərli sayılar və buna görə savab qazanar.

Valideynlərin övladlarını ibadətə öyrəşdirmək məqsədilə həddi-büluğa çatmadan öncə onları məcbur etmədən oruca təşviq etmələri gözəldir. Onlar xüsusilə qış aylarını, günlərin qısa olduğu zamanları fürsət bilməli və bunu gözəl şəkildə dəyərləndirməlidir. Lakin uşağın səhhətinə zərər gəlməməsinə diqqət edilməlidir. Əgər zərər ehtimalı olarsa, uşaqlara oruc tutdurmaq olmaz. Çünki o yaşda onların oruc tutması onsuz da fərz deyil, lakin sağlamlıqlarını mühafizə etmək valideynlərinə fərzdir. Fərz olan bir şeyi fərz olmayan başqa bir şeyə görə tərk etmək isə olmaz.

**Ağlı və huşu başında olmaq.** İslam dinində əmr və yasaqlar ağlı və huşu başında olan şəxslərə yönəlikdir. Huşu itmiş, komaya girmiş və ağlını itirmiş kəslər isə bu halları davam etdiyi müddətcə İslamın əmr və yasaqlarına görə məs'uliyyət daşımırlar. Bu səbəbdən dəlilərə, huşunu itirən, komaya girən xəstələrə, altsheymer xəstəliyinə tutulan şəxslər kimi yaddaş problemi yaşayanlara oruc tutmaq fərz deyil.

Bu şərtləri özündə cəm edən hər kəsə ramazan orucu fərzdir. Allah-Təala Qur'ani-Kərimdə buyurur: *«Ey iman edənlər, oruc tutmaq sizdən əvvəlki ümmətlərə fərz edildiyi kimi sizə də fərz edildi ki, Allahdan qorxub təqvalı olasınız.»* [əl-Bəqərə surəsi: 183]

Lakin bu üç şərti özündə cəm edən insanlar, yə'ni orucun onlara fərz olduğu şəxslər hamısı eyni qaydaya tabe deyil, əksinə bu insanlar aşağıdakı dörd sinfə bölünürlər:

**1) Orucu qəza[2] etməsi fərz olan kəslər.** Orucu qəza etməsi fərz olan kəslər oruc vaxtı heyz və nifas halı yaşayan qadınlardır. Heyz qadınlarda baş verən aybaşı halı, nifas isə doğum sonrası bilinən zahılıq halıdır. Bu halların baş verdiyi günlərdə qadınların oruc tutması haramdır, əgər oruc tutarlarsa buna görə günah qazanarlar. Bu halları yaşayan qadınların orucu ertələmələri, bu günlər bitdikdən sonra isə tərk etdikləri orucları qəza etmələri fərzdir.

Əgər ramazan ayının bir qismi bu halda keçərsə, bu hal bitdikdən sonra ramazan ayının qalan günlərinin orucu adi halda tutular, ramazan ayı çıxdıqdan sonra isə tərk edilmiş oruclar istənilən gündə qəza edilər.

**2) Orucu qəza etməsi caiz olan kəslər.** Orucu qəza etməsi caiz olan şəxslər üç sinifdir: 1) səfərdə olanlar, 2) oruc tutacağı təqdirdə xəstəliyinin artması və yaxud gec sağalmasından ehtiyyat edən xəstələr, 3) hamilə və yaxud süd əmizdirən qadınlar.

Birinci sinifdən olan şəxslər istərlərsə səfər müddətində oruc tuta bilərlər. Bu zaman tutduqları oruc keçərlidir və onlar buna görə savab qazanarlar. Lakin oruc tutmaq onlara çətin gəlməsə belə istərlərsə orucu ertələyərək daha sonra qəza edə bilərlər.

---

[2] Orucu qəza etmək tərk edilən günün orucunu sonradan tutmaqdır.

Onu da qeyd edək ki, səfər ediləcək yer ən az təqribən 83 km uzaqlıqda olmalı və səfərə çıxan şəxs gedəcəyi yerdə on beş gün və yaxud daha çox qalmağa niyyət etməməlidir. Səfərin məşəqqətli və yaxud məşəqqətsiz olmasının isə məsələyə heç bir tə'siri yoxdur.

Səfərdə olarkən orucu tərk etmək caiz olsa da, səfərdən qabaq tutulan orucu sırf səfər məqsədilə pozmaq olmaz. Misal üçün bir insan səfərə çıxmadan öncə oruc tutar, sonra səfərə çıxarsa tutduğu orucu sırf səfərdədir deyə aça bilməz. Həmçinin səfərdə olduğu günlər oruc tutarsa o orucu sırf səfərdə olduğu üçün poza bilməz. Lakin oruc tutmadan öncə səfərə çıxarsa, oruc vaxtı gəldiyi zaman oruc tutmaya bilər. Eləcə də səfərdə ikən oruc tutar, sonra xəstələnər və yaxud həlak olmaqdan ehtiyyat edərsə orucunu aça bilər.

İkinci sinifdən olan şəxslər də istərlərsə xəstəlik müddətində oruc tuta bilərlər. Bu zaman onların da tutduqları oruc keçərlidir və onlar buna görə savab qazanarlar. Lakin oruc tutacaqları təqdirdə xəstəliyin artmasından, yaxud gec sağalmasından ehtiyyat edərlərsə orucu ertələyərək daha sonra qəza edə bilərlər.

Onu da qeyd edək ki, bu qeyd etdiyimiz şeylər yüngül baş ağrısı, bədəndə hansısa bir sümüyün ağrısı, diş ağırısı, yüngül qızdırma və s. kimi orucla əlaqəsi olmayan və dərman qəbulu iftara qədər gecikdirilə bilən xəstəliklərə deyil, sırf oruc tutmaq səbəbiylə şiddətlənən xəstəliklərə aiddir.

Üçüncü sinifdən olan şəxslər orucun özləri və yaxud uşaqları üçün zərərli olacağından (məs: ananın və yaxud uşağın zəifləməsi, ananın taqətdən düşməsi, südün azalması və s.) ehtiyyat edərlərsə, orucu tərk edərək daha sonra qəza edərlər. Hətta süd əmizdirən qadın uşağın anası olmasa belə məsələnin hökmü dəyişmir.

**3) Orucu tərk edərək hər günün yerinə fidyə verəcək şəxslər.** Həddən çox qocalmış, əldən düşmüş yaşlılar və sağalmaz ağır xəstəliklərə düçar olan şəxslər bu sinfə aiddir. Onlar oruc tutmazlar, lakin qəza da edə bilməyəcəkləri üçün hər günün yerinə fidyə verərlər. Fidyənin nə olduğunu inşallah sonrakı səhifələrdə görəcəksiniz.

**4) Orucu vaxtında əda[3] etməsi fərz olan kəslər.** Orucun fərz olması üçün lazım olan üç şərti özündə cəm edən və yuxarıdakı üç qrupa aid olmayan hər kəsin orucu vaxtında tutması fərzdir.

**Tətbiqat:**

1) Bir nəfər səfərə çıxmadan öncə oruc tutur. Daha sonra səfərə çıxır və sırf səfərdə olduğu üçün orucunu açmaq istəyir. Bu şəxsin orucu açmasına izn yoxdur, çünki öncədən tutulan oruc sırf səfər məqsədilə açıla bilməz.

2) Bir nəfər səfərə çıxmadan öncə oruc tutur, lakin səfərdə ikən xəstələnir və orucunu açmayacağı təqdirdə xəstəliyinin şiddətlənməsindən ehtiyyat edir. Onun orucu açması caizdir, çünki bu vəziyyətdə orucu sırf səfərdə olduğu üçün deyil, xəstələndiyi üçün açır.

**Suallar və tapşırıqlar:**

1) Oruc kimlərə fərzdir?

2) Ramazanın ortasında həddi-büluğa çatmış birisinə öncəki günlərin oruclarını qəza etməsi fərzdirmi?

3) Əgər təbii prosseslərlə həddi-büluğa çatmaq baş verməzsə hansı yaşdan insan yetkin hesab edilir?

4) Həddən çox yaşlı, əldən düşmüş və oruc tutmağa qadir olmayan birisi aşağıdakılardan hansını edər?

a) Orucu vaxtında tutar.

b) Orucu qəza edər.

c) Orucu tərk edər və tərk etdiyi hər günün yerinə fidyə verər.

7) Səfərdə olan birisi istərsə orucu qəza edə bilər, bəs bu səfərin şərti nədir?

8) Nəyə görə kafirlərə oruc tutmaq fərz deyil?

9) Bir şəxs ramazan ayının ortalarında İslam dinini qəbul edərsə bu şəxsə kafir olduğu müddətdə tərk etdiyi orucları qəza etmək fərz olarmı?

10) Aşağıdakı bəndlərdən səhv olanlarını işarələ:

---

[3] Orucu əda etmək vaxtında tutmaqdır.

a) Huşu başında olmayan şəxslərə oruc tutmaq fərz deyil, çünki İslam dinində əmr və yasaqlar ağlı və huşu başında olan şəxslərə yönəlikdir.

b) Ramazanın ortalarında həddi-büluğa çatan şəxslərin öncədən tərk etdikləri orucları qəza etməsi fərz deyil.

c) Həddi-büluğa çatmadan öncə tutulan oruclar keçərlidir və bunlara görə savab yazılır.

ç) Süd əmizdirən qadın başqasının uşağına süd əmizdirərsə orucun xələl verməsindən ehtiyyat etsə belə orucu ertələyə bilməz, lakin uşaq öz uşağı olarsa ertələyə bilər.

d) Səfərə çıxan şəxs konfortlu təyyarə ilə səfər edər və çox rahat bir mehmanxanada yerləşərsə məşəqqət çəkmədiyi üçün orucu ertələyə bilməz.

e) Səfərdə olan birisi sırf səfərdədir deyə orucu ertələyə bilər, lakin səfərə çıxmadan öncə tutduğu orucu sırf səfərə çıxıb deyə poza bilməz.

11) Sonrakı səhifədə qeyd edilmiş cədvələ nəzər sal.

| | | |
|---|---|---|
| Ağıl sahibi və həddi-büluğa çatmış müsəlman | Orucu qəza etməlidir, əda etməsi haramdır. | • Heyzli qadın<br>• Nifaslı qadın |
| | Orucu istərsə qəza, istərsə əda edər. | • Səfərdə olan<br>• Oruc tutacağı təqdirdə xəstəliyinin şiddətlənməsindən və yaxud sağalmasının geçikməsindən ehtiyyat edən xəstə<br>• Özü və ya uşağı üçün ehtiyyat edən hamilə və yaxud süd əmizdirən qadın |
| | Orucu tərk edərək hər günün yerinə fidyə verər. | • Yaşlanıb əldən düşmüş, oruc tutmağa gücü çatmayan yaşlı<br>• Sağalmaz xəstəliyə tutulan, oruc tutmağa gücü və imkanı olmayan xəstə |
| | Orucu vaxtında tutmalıdır. | • Yuxarıdakı üç sinfə aid olmayan hər kəs. |

**Ramazan hilalı.** İslam dinində aylarla əlaqəli ibadətlər hicri-qəməri təqviminin aylarına görə hesablanır. Ramazan ayı da hicri-qəməri təqviminin doqquzuncu ayıdır.

Hicri-qəməri təqviminin ayları ya iyirmi doqquz, ya da otuz gün olur. Bu ayların iyirmi doqquz yaxud otuz gün olduğunu hilal tə’yin edir. Hilal ayın ilk görünüşüdür. Ramazan hilalı ramazan ayının girdiyini göstərən hilaldır. Hicri təqviminin bütün ayları kimi ramazan ayı da hilalın görünməsiylə tə’yin edilir. Ramazandan əvvəlki şa’ban ayının iyirmi doqquzuncu günü axşam namazının azanından sonra hilalın görünüb-görünməyəcəyini tə’yin etmək üçün baxılar. Burada iyirmi doqquzuncu günün axşam azanından sonra baxılması ona görədir ki, hicri-qəməri təqviminə görə yeni günə keçiş vaxtı gün batımından, yə’ni axşam namazının azanından sonradır. Bu səbəbdən ayın iyirmi doqquzmu yoxsa otuz günmü olduğunu tə’yin etmək üçün məhz iyirmi doqquzuncu günün axşam azanından sonra bu işə başlamaq lazımdır.



Hilal

Hilal göründükdən və bu iş üçün ayrılmış xüsusi qrup tərəfindən təsdiqləndikdən sonra bu xəbər dünyaya yayılır, beləliklə ramazan ayının girdiyi e’lan edilir.

Əgər hava buldulu olar və yaxud açıq olsa da hilal görünməzsə, bu zaman şa’ban ayı otuzuncu günüylə tamamlanar, ondan sonrakı gün isə ramazanın ilk günü hesab edilər. Çünki hicri təqvimdə aylar ən çox otuz gün olur.

Hilalı görmək üçün adətən müxtəlif yerlərdən çox sayda insan çıxdığı üçün bu gün artıq ramazanın tə’yin edilməsi rahatdır. Çünki bir-birindən xəbər tutmaq olduqca asandır. Müəyyən bir yerdə beş-on nəfər, bir başqa yerdə də yenə bu sayda insan hilalı gördüyü zaman bir-birinə xəbər verir, beləcə lazım olan sayda insanın xəbəri təsdiqlənərək yayılmış olur.

Hilal dünyanın hər hansı bir yerində görünərsə, bütün dünya müsəlmanları üçün keçərli olar.

Hilalı görə bilmək üçün binaların olmadığı, buxarlanmanın az olduğu, əlverişli yüksəkliyin olduğu yerlərə getmək lazımdır.

**Bayram hilalı.** Bayram hilalı və yaxud başqa bir adla şəvval hilalı ramazanın çıxdığını, şəvval ayının girdiyini bildirən hilaldır. Bayram hilalı haqda da eyni şey keçərlidir. Ramazan ayının iyirmi doqquzuncu gününün axşam namazı azanından sonra hilalın izlənməsi başlar. Əgər hilal görünərsə ramazan ayının iyirmi doqquz gün olduğuna qərar verilər, hilal görünmədiyi təqdirdə isə ramazan ayı otuz günə tamamlanar.

Əvvəlcədən aparılmış astronomik hesablamalara görə ramazan ayını tə'yin etmək yanlışdır, bu şəkildə ramazana başlamaq keçərli deyil. Mö'minlər «artıq texnologiya inkişaf edib»- deyə insanları fəqihlərin yolundan uzaqlaşdıraraq yanlış yönləndirən şəxslərə qulaq asmamalıdır. Çünki hesablama üçün texnologiyanın inkişaf etməsi elə də şərt deyil. Qədimdə də dəqiq hesablamalar olmuşdur, lakin fəqihlər bu cür hesablamalara e'tibar etməmişdir.

Bundan əlavə hilalı gözlə görmək üçün bir az vaxt ayırmaq elə də məşəqqətli iş deyil. Görəsən boş-boş danışmaq yerinə ilin iki günündə yarım saatını bu işə sərf etməyə tənbəllik edən insanların dinə görə narahat olması özlərinə inandırıcı gəlirmi? Xüsusilə nəzərə alsaq ki, bu işi (hilal izləməyi) görən insanlar hər zaman var. O zaman əli cibində oturaraq fəqihlərin görüşünə müxalif şeylər söyləməyi ağıllı olmaq hesab edən kəsləri dinləməyə nə ehtiyac var?

Bundan əlavə unutmamaq lazımdır ki, hilal axtarışına çıxılarkən yaşanan həyəcan və sevincin yerini heç bir şey verməz.

**Tətbiqat:**

1) Misir, Səudiyyə Ərəbistanı və İndoneziyada hilal izləməyə çıxan şəxslər hilalın göründüyünü xəbər verdi. Türkiyə və Əlcəzairdən isə hilalın görünmədiyi xəbərləri gəldi. Bu durumda hilalı görənlərin sözü əsas alınar. Çünki hilal dünyanın hansısa bir hissəsində görünərsə, bu bütün dünya müsəlmanları üçün keçərli olar.

2) Hilalı izləməyə çıxanlar hilalın görünmədiyini bildirdi. Yer üzündə hilalı izləməyə çıxan heç bir qrupdan hilalın görünməsiylə əlaqəli xəbər gəlmədi. Türkiyə isə öncədən hazırladığı təqvimə

əsasən sabah ramazan ayının ilk günü olduğunu bəyan etdi. Türkiyənin bəyanına e’tibar edilməz, çünki ramazanın tə’yini hilala bağlıdır, öncədən aparılmış hesablamalarla əməl etmək olmaz.

**Suallar və tapşırıqlar:**

1) Hilal nədir?
2) Hicri-qəməri təqviminin ayları ən az neçə gün olur?
3) Nəyə görə ramazan ayının girib-girmədiyini tə’yin etmək üçün öncəki ayın, şa’ban ayının iyirmi doqquzuncu günündə hilal axtarışına çıxılır?
4) Öncədən aparılmış hesablamalara əsasən təqvimlərdə ramazan ayının ilk gününün tə’yin edilməsinə e’tibar edilərmi? Bu məsələdə müasirlikdən dən vuranlara necə cavab vermək olar?

## ORUC TUTMA VƏ AÇMA ŞƏKLİ

**Niyyət.** Orucun səhih olması üçün niyyət şərtdir. Bir insanın pəhriz məqsədilə ac qalması oruc yerinə keçməz. Oruc tutacaq hər kəs buna diqqət etməlidir. Bə'zən orucun vücuda olan faydalarından o qədər bəhs edilir ki, insan özü də hiss etmədən əslində sırf sağlam olması üçün pəhriz məqsədilə ac qalır. Bu cür yanlış hallara yol verməmək üçün insan orucu sırf oruc olduğu üçün, dinin əmrini yerinə yetirmək məqsədilə tutduğunu xatırlamalıdır.

*Niyyətin şəkli.* Niyyətin xüsusi deyiliş tərzi yoxdur. İnsanın oruc tutduğunu bilməsi niyyət hesab edilir. Hətta sahur yeməyi üçün yuxudan qalxmaq özü də niyyət sayılır. Bununla birgə insanın dillə «Allah rizası üçün oruc tuturam» deməsi daha yaxşıdır. Çünki qəlbin bilməsi ilə dilin söyləməsi bir arada olarsa insanın əzmi güclənər və ibadəti daha yaxşı xatırlayar.

*Niyyətin vaxtı.* Oruc tutan şəxs ramazan orucunu əda olaraq tutursa, niyyəti bir öncəki günün axşam namazından oruc tutulan günün zöhr namazından təqribən bir saat əvvələ qədər etməlidir.

Əgər oruc tutan şəxs tərk etdiyi ramazan orucunun qəzasını, yaxud cərimə orucunu tutursa bu zaman niyyəti bir öncəki günün məğrib namazı ilə oruc gününün sübh namazının girişi arasındakı zaman kəsiyində etməsi şərtdir. Sübh namazı girdikdən sonra edilən niyyət keçərli deyil.

Onu da qeyd edək ki, ramazan ayının hər gününün orucu üçün ayrıca niyyət etmək şərtdir. Çünki hər günün orucu ayrıca bir ibadətdir, bu səbəbdən hər biri ayrıca niyyətə ehtiyac duyur.

*Niyyətin tə'yini.* Niyyətin tə'yini niyyət edərkən orucun növünü xatırlamaqdır. Misal üçün «Allah rizası üçün bu ilki ramazan orucunu tuturam», yaxud «Allah rizası üçün keçən il pozduğum ramazan orucunun qəzasını tuturam» şəklində niyyət edərək hansı orucu tutduğunu xatırlamaqdır.

Əgər oruc tutan şəxs ramazan orucunu vaxtında tutursa orucun növünü xatırlamağa ehtiyac yoxdur. Bu zaman xüsusilə ramazan orucuna niyyət etmədən, ümumi olaraq «Allah rizası üçün oruc tuturam» - deyə niyyət edilsə belə keçərlidir.

Əgər tutulan oruc ramazan orucunun qəzası, yaxud cərimə orucudursa bu zaman niyyət edərkən orucun növünü xatırlamaq şərtdir. Misal üçün keçən ilin ramazan orucunun qəzasını tutan birisi «keçən ilin ramazan orucunun qəzasını tuturam», yaxud

«Allah rizası üçün boynumda qalan ramazan orucunun qəzasını tuturam» şəklində niyyət etməlidir.

Cərimə orucları tutan birisi də «Allah rizası üçün cərimə orucu tuturam» - deyə niyyət etməlidir.

**Sahur.** Oruc tutarkən yeyilən yeməyə «sahur» deyilir. Sahur yeməyi yemək gözəldir. Allah-Təala Qur'ani-Kərimdə buyurur: *«(Oruc günləri) sübh çağı ağ ip qara ipdən (dan yerinin ağartısı gecənin qaranlığından) seçilənə qədər (sübh namazı girənə qədər) yeyib-içə bilərsiz.»* [əl-Bəqərə surəsi: 187]

Sahur yeməyinin sübh namazından təqribən on beş dəqiqə əvvələ qədər yeyilib-bitirilməsi gözəldir. Bundan əlavə sahur vaxtı gün ərzində insana ağırlıq verəcək qidalardan uzaq durmaq lazımdır.

Sahur süfrəsində ailəcə oturmaq daha gözəldir. Hətta oruc tutmayanların belə o vaxtın bərəkətindən məhrum olmaması, oruc tutanlarla bərabərlik sərgiləməsi üçün sahur süfrəsində oturması gözəldir.

**İftar.** Oruc açarkən yeyilən yeməyə «iftar» deyilir. İftarın vaxtı axşam azanının vaxtıdır. Allah-Təala Qur'ani-Kərimdə belə buyurur: *«(Sahur yeməyini yedikdən sonra) orucunuzu gecəyə qədər tutun.»* [əl-Bəqərə surəsi: 187]

İslama görə gecə, məğrib namazının girməsiylə başlayır, məhz həmin vaxt yeni günə keçilir. Ayədə «gecə» deyilərkən qəsd olunan da məhz məğrib (axşam) namazının vaxtıdır.

İftar vaxtı bu cür dua etmək gözəldir: «Allahım, sənin rizanı qazanmaq üçün oruc tutdum, sənin ruzin ilə orucumu açıram, sənə iman etmişəm və sənə sığınıram, sabahkı günün orucuna da niyyət edirəm, mənim keçmiş və gələcək günahlarımı bağışla.» İftar suyunu içdikdən sonra isə bu cür demək gözəldir: «Susuzluğum getdi, damarlarım islandı və inşallah savab da yazıldı.»

**Tətbiqat:**

1) Ramazan günü oruc tutacaq şəxs işa namazından sonra yuxusu ağır gəldiyi üçün yatmaq istəyir. Bu səbəbdən növbəti oruca niyyət edərək yatır. Daha sonra günorta yuxudan oyanır. Bu şəxsin orucu keçərlidir. Çünki ramazan orucunun ədasının niyyəti axşam namazı ilə oruc tutulan günün zöhr namazından bir saat

əvvələ qədər istənilən vaxt edilə bilər. Bu şəxs də işa namazından sonra yatmadan öncə niyyət etmişdir.

2) Ramazan günü oruc tutacaq kəs işa namazından sonra növbəti oruca niyyət etmədən yatır və zöhr namazından saat yarım əvvəl oyanır. Bu şəxs oyandıqdan sonra orucu pozacaq hallardan hər hansı birini etməyibsə oruca niyyət edə bilər. Çünki zöhr namazından bir saat əvvələ qədər niyyət etmək keçərlidir.

3) Ramazan günü oruc tutacaq kəs işa namazından sonra növbəti oruca niyyət etmədən yatır və zöhr namazında yuxudan oyanır. Bu şəxsin həmin gün oruca niyyət etməsi keçərli deyil, çünki niyyət ən gec zöhr namazından bir saat əvvələ qədər edilməlidir.

4) Qəza orucu tutacaq şəxs oruca niyyət etmədən yatır, sübh azanından yarım saat sonra isə oyanır. Bu şəxs o gün qəza orucuna niyyət edə bilməz, çünki ramazan orucunun qəzasının niyyəti sübh namazının azanına qədər edilməlidir.

**Suallar və tapşırıqlar:**

1) Niyyət nədir?

2) Nəyə görə həm qəlb, həm də dillə niyyət daha yaxşıdır?

3) Cümlədəki boşluqları doğru şəkildə doldur: Əgər oruc ədadırsa niyyəti ... zaman kəsiyində etmək şərtdir. Əgər qəzadırsa niyyəti ... zaman kəsiyində etmək şərtdir.

4) Hansı oruclara niyyət edərkən orucun növünü tə’yin etmək lazımdır?

5) Sahur və iftar nədir?

## ORUCU POZAN HALLAR

Oruc sübh namazının azanından axşam namazının azanına qədər orucu pozan şeyləri tərk etməkdir. Orucu pozan şeylər iki növə bölünür: 1) həm qəzanı, həm də cəriməni (kəffarəni) vacib edən hallar, 2) təkcə qəzanı fərz edən hallar. Cərimənin nə olduğunu inşallah sonrakı səhifələrdə görəcəksiniz.

Həm qəzanı həm də cəriməni vacib edən hallar iki şeydir: 1) boğazdan aşağı nəsə getməsi, 2) cinsi həzz.

**Boğazdan aşağı nəsə getməsi.** Boğazdan aşağı gedən şeylərin qəza orucundan əlavə cəriməni də vacib etməsi üçün beş şərt var:

1) Qəbul edilən şeylərin faydalı və yaxud həzz verici şeylər olması. Bu şərtə əsasən:

• İnsanların normal şəkildə qidalandığı şeyləri yeyib-içmək qəza orucundan əlavə cəriməni də vacib edir. Çünki bu şeylər həm vücuda faydalıdır, həm də insana həzz verir.

• Dərman udmaq qəza orucundan əlavə cəriməni də vacib edir, çünki dərman faydalıdır.

• Həyat yoldaşlarının sevişmə əsnasında bir-birinin ağız suyunu udması qəza orucundan əlavə cəriməni də vacib edir, çünki adi haldan fərqli olaraq sevişmə əsnasında ağız suyunu udmaq həzz verir.

• Siqaret və yaxud nargilə çəkmək qəza orucundan əlavə cəriməni də vacib edir, çünki siqaret çəkmək həzz verir.

2) Ramazan ayında qəbul edilməsi. Ramazan ayı xaricində oruc tutan birinin yeyib-içməsi və yaxud dərman qəbul etməsi qəzanı fərz etsə də cəriməni vacib etmir.

3) Oruc tutduqdan sonra qəbul edilməsi. Ramazan ayında oruca niyyət etməyən birisinin yeyib-içməsi qəza orucunu fərz etsə də cəriməni vacib etmir.

4) Qəsdən və istəyərək qəbul edilməsi. İstəmədən boğazına su qaçan birinin orucu qəza etməsi fərz olsa da cərimə vacib deyil. Bir şeyin istəməyərək baş verməsi ilə unutqanlıqla baş verməsi fərqlidir. Belə ki, birinci halda şəxs oruc tutduğunu xatırlayır.

5) Zərurət olmadan qəbul edilməsi. Oruc tutan birisi ağır şəkildə xəstələnər, qidalanmayacağı və yaxud dərman qəbul etməyəcəyi təqdirdə vəziyyətin daha da pisləşəcəyindən ehtiyyat etdiyi

üçün orucunu pozarsa, o günün orucunu qəza etməsi fərz olsa da cərimə vacib olmaz.

**Cinsi həzz.** Cinsi həzzin qəza orucundan əlavə cərimənin də vacib etməsi üçün üç şərt olmalıdır:

1) Ramazan ayında baş verməsi. Ramazan ayı xaricində oruc tutan birinin cinsi əlaqədə olması qəzanı fərz etsə də cərimənin vacib etmir.

2) Oruc tutduqdan sonra baş verməsi. Ramazan ayında oruca niyyət etməyən birisinin cinsi əlaqədə olması qəza orucunu fərz etsə də cərimənin vacib etmir.

3) Cinsi yolla baş verməsi. Cinsi yolla qəsd edilən həm ön həm də arxadır[4]. Sevişmə əsnasında cinsi əlaqə olmadan boşalmaq həmin günü qəza etməyi fərz etsə də cərimənin vacib etmir.

Bu qeyd etdiyimiz hallardan əlavə orucu pozan hallar sadəcə qəza orucunu fərz edir. Bu hallar aşağıdakılardır:

1) Qəbul edilməsi faydasız və həzsiz olan şeylərin boğaz yoluyla daxilə ötməsi. Bişməmiş lobya, kağız, çöp və s. kimi şeyləri yemək orucu pozaraq təkcə qəza orucunu fərz edir. Çünki bu şeylərin xam şəkildə yeyilməsi vücuda faydalı deyil. Həmçinin bunları qəbul etmək insana həzz də vermir.

2) Adətən boğaza çatmasından qorunmaq mümkün olan şeylərin istəmədən boğaza qaçması. Misal üçün boğaza istəmədən su və yaxud dərman qaçması bu növdəndir. Çünki adətən bu şeylərin boğaza qaçmasından insan özünü qoruya bilər. Lakin bu hal istəmədən baş verdiyi üçün cərimə vacib olmur.

3) Boğaz yolundan başqa yollarla daxilə nəyinsə getməsi. Qulaq, burun, anus yoluyla yağ və yaxud dərman qəbul etmək bu növdəndir.

4) Buruna şiddətlə su çəkərək suyun daxilə ötürülməsi. Bu da orucu pozan və təkcə qəzanı fərz edən hallardandır. Burunun qüsl və dəstəmaz sırasında normal şəkildə yuyulması isə orucu pozmur.

5) Qulağa qəsdən su daxil etmək. Bu da orucu pozan hallardandır və təkcə qəzanı fərz edir. Burada söhbət şəxsin bilərək içəri

[4] Arxadan cinsi əlaqə haramdır.

su getməsini istəməsidir. Çimərkən qulağın normal şəkildə yuyulması isə orucu pozmur.

6) Sübh namazının girmədiyini düşünərək sahur yeməyinə davam etmək, eləcə də axşam namazının girdiyini düşünərək iftar yeməyinə başlamaq. Hər iki halda orucu pozmaq qəsd edilmədiyi üçün bu hallar da təkcə qəzanı fərz edir.

7) İstimna (masturbasiya) yoluyla və yaxud sevişmə əsnasında boşalmaq. Bu da orucu pozan və təkcə qəzanı fərz edən haldır, çünki burada cinsi əlaqə yoxdur.

8) Ağır xəstəlik kimi zərurət səbəbiylə orucu pozmaq. Burada zərurət olduğundan təkcə qəza orucu fərz olar.

9) Bilərək özünü qusdurmaq.

10) Ramazan ayı xaricində tutulan orucları istənilən şəkildə pozmaq.

**Tətbiqat:**

1) Oruc tutan birisi kağız paketi dişiylə açmağa çalışarkən qopardığı kağızı udur. Bu şəxsin orucu pozulur, qəza etməsi fərz olsa da cərimə vacib olmur. Çünki kağız yeyilən bir şey deyil.

2) Ramazanda oruc tutan birisi xam üzüm yarpağı yedi. Bu şəxsin orucu pozulur və ona həm qəza həm də cərimə vacib olur. Çünki üzüm yarpağı xam şəkildə də yeyilən bir şeydir.

3) Ramazanda oruc tutan birisi əsəbləşdiyi üçün siqaret çəkdi. Bu şəxsin orucu pozulur və ona qəzadan əlavə cərimə də vacib olur. Çünki siqaret adətən həzz məqsədilə çəkilir. Əsəbi halda çəkilməsi məsələnin hökmünü dəyişmir, çünki bu durum əsəbləşdiyi üçün su içən şəxsin durumu kimidir.

4) Ramazanda oruc tutan birisi ağzına düşən yağış və yaxud qar damlasını bilərək uddu. Bu şəxsin orucu qəza etməsi fərzdir, bundan əlavə cərimə də ona vacib olur, çünki su qida vasitəsidir və bilərək udulub.

5) Ramazanda oruc tutan birisi dilindəki yaranı dərmanla silmək istərkən dərman istəmədən boğazına qaçır. Bu şəxsin orucu pozulduğu üçün qəza etməsi fərzdir, lakin bu hal istəmədən baş verdiyi üçün cərimə vacib olmaz.

6) Ramazanda oruc tutan birisi öz xanımıyla sevişir. Lakin onun ağız suyunu udmadan ağzını suyla çalxalayaraq boşaldır. Bu

şəxsin orucu pozulmur, çünki xanımının ağız suyunu udmamışdır.

7) Qəza orucu tutan birisi özünü saxlaya bilməyib xanımıyla cinsi əlaqədə olur. Bu şəxsin orucu pozulduğu üçün həmin günü yenidən tutması fərzdir, lakin o orucu pozduğu üçün əlavə cərimə vacib deyil, çünki cərimənin vacib olması üçün oruc məhz ramazan ayında pozulmalıdır.

8) Ramazanda oruc tutan şəxs ayaqyolunda özünü yuyarkən sulu barmağı arxa dəliyinə və yaxud ön dəliyinə girdi. Bu şəxsin orucu pozulur və qəza etməsi fərz olur. Çünki anus, eləcə də vagina yoluyla vücuda nəyinsə daxil olması orucu pozur. Lakin bu şəxsə cərimə vacib olmur, çünkü cərimənin vacib olması üçün suyun daxilə məhz boğaz yoluyla keçməsi lazımdır.

**Suallar və tapşırıqlar:**

1) Orucu pozan halların qəza orucundan əlavə cəriməni də vacib etməsi üçün hansı şərtlər olmalıdır?

2) Ərlə xanımının öpüşməsi nə zaman həm qəza orucunu həm də cəriməni vacib edir?

3) Dərman vasitələri nə zaman təkcə qəza orucunu vacib edir?

4) İstəmədən bir şey udmaqla unudaraq udmaq arasında fərq nədir?

5) Qəza orucunu bilərək pozmaq nəyə görə cəriməni vacib etmir?

6) Qida məhsullarını yemək hansı hallarda həm qəza orucunu həm də cəriməni vacib edir?

7) Aşağıdakı bəndlərdən səhv olanı işarələ:

a) Burun yoluyla dərman qəbul etmək təkcə qəza orucunu fərz edir.

b) Ağıza istənmədən düşən yağış damlasını bilərək udmaq həm qəza orucunu həm də cəriməni vacib edir, lakin bu yağış suyu istənmədən boğaza qaçarsa təkcə qəza orucu fərz olur.

c) Ərlə xanımı sevişmə əsnasında bir-birinin ağız suyunu udarsa oruclari pozulmaz, çünki ağız suyu adi sudan fərqlidir.

ç) Cərimənin vacib olması üçün pozulan orucun ramazan ayında pozulması lazımdır.

## ORUCU POZMAYAN HALLAR

Az öncə qeyd etdiyimiz hallardan əlavə bə'zi hallar var ki, onlar oruca zərər vermir. Bu hallar aşağıdakılardır:

1) Orucu pozan şeylərin unutqanlıqla baş verməsi. Oruclu olduğunu unudaraq yeyən, içən və yaxud cinsi əlaqədə olan birisinin orucu pozulmaz.

2) Diş arasında qalan az miqdarda qidanın udulması. Əgər diş arasında qalan qidalar hamısı bir yerdə noxud qədərdirsə onların udulması orucu pozar, bundan az miqdarda qidanın udulması isə oruca zərər verməz.

3) Yuxuda ikən boşalmaq.

4) Suyu ağızda çalxalayıb boşaltdıqdan sonra ağızda qalan suyu udmaq.

5) Bəlğəmin və yaxud burundakı fırtılığın içəri çəkilərək udulması.

6) Orucu pozmağa niyyət edib pozmamaq.

7) Qan aldırmaq. İstər həcəmət məqsədilə, istərsə də analiz məqsədilə həkimdə qan aldırmaq orucu pozmur.

8) Çimmək.

9) Ərlə xanımının sevişməsi və yaxud oynaşması. Ərlə xanımının sevişməsi və yaxud oynaşması orucu pozmaz. Lakin bunun cinsi əlaqəyə yol açmayacağından əmin olmaq lazımdır. Əgər bundan əmin olunmazsa hər iksi məkruhdur.

Bundan əlavə az öncə qeyd etdiyimiz kimi sevişərkən bir-birinin ağız suyunu udmamağa xüsusilə diqqət etmək lazımdır. Çünki udularsa həm qəza orucu həm də cərimə vacib olar.

10) Boğaza qaçmasını əngəlləmək adətən mümkün olmayan şeylərin boğaza qaçması. Gəyirmə əsnasında qeyri-iradi olaraq gələn suyun, eləcə də qastro-ezofageal reflyuks xəstəliyi olan şəxslərin boğazına gələn yandırıcı suyu udmaları bu növdəndir.

Həmçinin boğaza istəmədən toz, tüstü və milçək qaçması da orucu pozmur.

## QƏZA ORUCU, CƏRİMƏ VƏ FİDYƏ

**Qəza orucu.** Qəza orucu adi orucdan təkcə vaxtı ilə fərqlənir. Ramazan ayında tutulan oruc əda, ramazanda tərk edilən orucun ramazandan sonra tutulması isə qəza orucu adlanır.

*Qəza orucunun vaxtı.* Qəza orucunun müəyyən bir vaxtı yoxdur. Yalnız il ərzində oruc tutulması yasaq olan beş gündə qəza orucu tutulmaz. Bu beş günün hansı günlər olduğunu inşallah sonrakı səhifələrdə görəcəksiniz.

Bir insan ramazan orucunun qəzasını bir sonrakı ramazan orucuna qədər tutmazsa ona əlavə heç nə vacib olmaz. Sadəcə həmin ramazan ayı çıxdıqdan sonra öncəki ramazan ayının qəzasını tutar.

Qəza orucunun pozulması səbəbiylə ikinci bir qəza orucu fərz olmaz, sadəcə pozulan qəza orucu yenidən tutular.

**Cərimə.** Cəriməni vacib edən səbəblərlə orucu pozmanın cəriməsi bir gün qəzadan əlavə dalbadal altmış gün oruc tutmaqdır. Əgər bu altmış gün arasında bir gün ara verilərsə tutulmuş bütün cərimə oruclları qüvvədən düşər və yenidən altmış gün oruc tutmaq vacib olar. Lakin bu ara heyz səbəbilə olarsa öncədən tutulan cərimə oruclları qüvvədə qalar, heyz günləri bitdikdən sonra isə qalan cərimə oruclları tutular.

**Fidyə.** Fidyə isə tərk edilən hər günün yerinə bir kasıbı iki dəfə (səhər-axşam) doyacağı qədər yedirmək və yaxud həmin yeməyin pulunu ona verməkdir.

*Cərimə təkrarlanarmı?* Cəriməni vacib edən hallar istər bir ramazan içində, istərsə də eyni gün içində təkrarlansın, hər birinə görə ayrı-ayrı cərimə vacib olmaz. Misal üçün bir ramazan içində bir neçə dəfə orucunu pozan, yaxud bir gündə bir neçə dəfə cinsi əlaqədə olan şəxsin bir cərimə ödəməsi kifayətdir. Lakin bir ramazanda pozduğu orucun cərimələsini ödədikdən sonra növbəti ramazanda yenidən orucunu pozarsa, öncədən ödədiyi cərimə sonrakı ramazanın yerinə keçməz və həmin şəxsin sonrakı ramazan üçün ayrıca cərimə ödəməsi vacib olar.

*Cərimə oruclarını pozmaq.* Cərimə oruclarının pozulması əlavə bir cəriməni deyil, sadəcə pozulan günü təkrar tutmağı vacib edir. Çünki cəriməni vacib edən şərtlərdən biri də orucun məhz ramazan ayında pozulmasıdır.

*Cərimə nə zaman silinər?* Əgər orucu bilərək pozan birisi həmin gün xəstələnər, yaxud qadındırsa həmin gün heyz halı başlayarsa o gün orucu pozması səbəbilə boynunda qalan cərimə borcu silinər.

*Cərimə və fidyəyə qadir olmamaq.* Cərimə oruclarını tutmağa qadir olmayanlar, hər cərimə orucunun yerinə bir yoxsulu səhər-axşam doyurmalı, yaxud bunun üçün lazım olan pulu ona verməlidir. Yə'ni cəriməyə gücü yetməyən fidyə ödəməlidir. Altmış yoxsulu doyurmağa xərclənəcək pullar bir neçə yoxsul arasında bölüşdürülə biləcəyi kimi tək yoxsula da verilə bilər.

Fidyə verməyə gücü çatmayanlar isə Allahdan bağışlanma diləyərlər.

**Suallar və tapşırıqlar:**

1) Əlli doqquz gün dalbadal cərimə orucu tutan biri altmışıncı gün oruc tutmadan ara verərsə tutduğu cərimə oruclari qüvvədə qalarmı?

2) Nəyə görə cərimə orucunu pozmaq səbəbilə əlavə cərimə vacib olmur?

3) Cəriməni vacib edən halların təkrarlanması cərimənin sayını artırarmı?

4) Fidyənin miqdarı nədir?

5) Fidyənin hamısını ayrı-ayrı yoxsullara vermək olar? Bəs hamısını bir yoxsula vermək necə?

6) Cərimə orucu tuta bilməyən fidyə verər, bəs fidyəyə imkanı çatmayan neyləməlidir?

7) Cərimə borcu nə zaman silinər?

8) Hansı günlərdə qəza orucu tutmaq olmaz.

Ramazan ayı əsasən oruc ayı olsa da bu ayda orucdan başqa ediləcək ibadətlər də mövcuddur. Bu ibadətlər təravih namazı, e'tikaf, fitrə zəkatı və bayram namazıdır. Bu sonuncusu ramazan ayı çıxdıqdan sonra qılınır.

## Təravih Namazı

Təravih namazı ramazan gecələrinə xas güclü sünnət namazıdır. Bir bölgə camaatı toplu şəkildə təravih namazını camaatla qılmağı tərk edərsə orada yaşayan hər kəs günaha girər. Lakin bir qism insan camaatla qılarsa başqaları tək başına da qıla bilər.

**Təravih namazının vaxtı və rükət sayı.** Təravih namazı iyirmi rükətdir. Ramazan gecələri işa namazının son sünnətindən sonra sübh namazına qədər olan vaxt ərzində qılına bilər.

**Təravih namazının qılınış şəkli.** Təravih namazı iki-iki qılınar. Bu namazın hər dörd rükətindən bir dincəlmək müstəhəbdir. Dincəlmə müddəti dörd rükət qılınarkən sərf edilən vaxt qədər olarsa daha yaxşı olar. Bu müddət ərzində zikr və dua etmək gözəldir.

**Təravih namazının qəzası varmı?** Təravih namazının qəzası yoxdur. Bu namazın hamısını və yaxud bir qismini qılmayan birisi sonradan nə ramazan ayı içində nə də ramazan ayı çıxdıqdan sonra qəza edər.

## E'tikaf

E'tikaf məsciddən çıxmamaq şərtilə insanın özünü ibadətə həsr etməsidir. Ramazan ayının son on günündə kişilərin məsciddə e'tikafa girməsi sünnətdir. Qadınlara gəlincə, onlar məsciddə e'tikafa girməzlər. Əgər evlərində namaz qılmaları üçün ayırdıqları xüsusi bir otaq olarsa o yerdə e'tikafa girmələri gözəldir. Bu cür xüsusi bir otaq yoxdursa qadınlar e'tikafa girməzlər.

**E'ikafın səhih olması üçün şərtlər.** E'tikafın səhih olması üçün məscidə sırf e'tikaf niyyətilə girmək və bundan sonra məsciddən zərurət olmadan çıxmamaq lazımdır. Qüsl almaq, ayaqyo-

luna getmək və s. kimi zəruri səbəblərlə məsciddən çıxmaq olar, lakin ehtiyac xaricində məsciddən kənarda qalmaq olmaz.

İnsanın bədənini və yaxud başını dözülməz dərəcədə qaşınma tutması səbəbiylə çimib təmizlənməyə getməsi, yemək gətirəni yoxdursa yemək gətirməyə çıxması və s. hallar da zərurət sayıldığından bu səbəblərlə də məsciddən çıxmaq olar.

Əgər qadın öz evində e'tikafa girmək istərsə onun heyz və nifas günlərində olmaması da şərtdir.

E'tikaf zamanı xüsusilə çoxlu Qur'an oxumaq, başqa dini kitablar mütaliə etmək, zikrlər etmək, dünya söhbətlərindən, boş söz və davranışlardan uzaq durmaq, bir sözlə vaxtı əzəmi dərəcədə ruhani abu-havada keçirmək lazımdır. Çünki e'tikafın əsas məqsədi insanın ruhaniyyatını gücləndirməsidir.

**E'tikafı pozan hallar.** E'tikafın səhih olması üçün lazım olan şərtlərin hər hansı biri olmazsa e'tikaf pozular. Məsciddən zəruri üzr olmadan çıxmaq, qadının heyz günlərinin başlaması e'tikafı pozan hallardır.

## Fitrə Zəkatı

**Fitrə zəkatı nədir və kimə vacibdir?** Fitrə zəkatı ramazan ayının sonunda verilən zəkatdır. Bu zəkatı vermək vacibdir, lakin vacib olması üçün insanın bu iki şərti özündə cəm etməsi lazımdır: 1) müsəlman olmaq, 2) əsli ehtiyaclardan əlavə nisaba sahib olmaq.

*Əsli ehtiyaclar.* Əsli ehtiyac deyildikdə qəsd olunan ev, evin zəruri əşyaları, minik, geyim, bir illik ərzaq və borclardır. İstifadə olunmayan ikinci ev, ikinci maşın, bir neçə mərtəbəli evin istifadə edilməyən mərtəbələri, çox otaqlı evin istifadə edilməyən otaqları, zəruri miqdardan əlavə paltarlar isə əsli ehtiyacdan sayılmır.

*Nisab miqdarı.* Nisab fitrə zəkatının vacib olması üçün əsli ehtiyaclardan əlavə müəyyən mal limitidir. Bu limit 80 qr. qızıl və yaxud 600 qr. gümüş dəyərində maldır. Əgər bir müsəlmanın əsli ehtiyaclarından əlavə sahib olduğu malın dəyəri 80 qr. qızıl və yaxud 600 qr. gümüş dəyərində və ya daha artıq olarsa bu şəxsin fitrə zəkatı verməsi vacibdir.

**Fitrə zəkatının minimal miqdarı.** Yuxarıda qeyd etdiyimiz şərtlərə sahib hər müsəlmana ən az 2 qr. qızıl və yaxud 15 qr. gümüş dəyərində fitrə zəkatı çıxarmaq vacibdir.

**Fitrə zəkatının vaxtı.** Fitrə zəkatı bayram gününün sübh namazının girməsiylə vacib olur. Lakin bu vaxtdan öncə də çıxarmaq mümkündür. Yaxşı olar ki, bayram namazından öncə çıxarılsın. Çünki bayram günü yoxsulların əlinə pul gəlməsi onları həm sevindirər, həm də bayramı nisbətən daha yaxşı keçirmələrinə səbəb olar. Bu səbəbdən fitrə zəkatını bayramdan bir gün əvvəl, və yaxud bayram namazından öncə çıxarmaq daha yaxşı, daha məqsədəuyğundur.

**Fitrə zəkatı nəylə verilər?** Fitrə zəkatı verərkən ən gözəl olanı pulla verilməsidir. Çünki yoxsul şəxs öz ehtiyacını hər kəsdən daha yaxşı bilir. Əgər zəkat ona pul şəklində verilərsə onu öz ehtiyacları üçün daha səmərəli istifadə edə bilər.

**Fitrə zəkatı nə cür verilər?** Fitrə zəkatını verərkən iki şeyə diqqət etmək lazımdır: 1) niyyət, 2) pulu yoxsulun ixtiyarına keçirmək.

*Niyyət.* Fitrə zəkatını verərkən onu sırf fitrə zəkatı qəsdi ilə, bu niyyətlə vermək şərtdir. Bu səbəbdən hədiyyə və başqa niyyətlə verilən pullar fitrə zəkatı yerinə keçmir. Lakin niyyəti açıq şəkildə bildirmək şərt deyil. Zəkatı verən şəxs qəlbində fitrə zəkatı verməyi qəsd edərsə, üzdə pulu verdiyi yoxsula bunun hədiyyə olduğunu deyə bilər. Əgər zəkatı alan şəxsin utancaq biri olduğu bilinərsə onu utandırmamaq üçün bu cür etmək daha yaxşıdır.

*Pulu yoxsulun ixtiyarına keçirmək.* Pulu yoxsulun ixtiyarına keçirmək onu yoxsulun özünə çatdırmaqdır. Buna fiqhdə «təmlik» deyilir. Bu səbəbdən borcu bağışlamaq, qonaqlıq vermək və s. kimi şeylər qətiyyən fitrə zəkatı yerinə keçmir.

**Fitrzə zəkatı kimlərə verilər?** Fitrə zəkatı aşağıdakı sinifdən olan şəxslərə verilər:

1) Əsli ehtiyaclara sahib olmayan şəxslər, yaxud əsli ehtiyacları olsa da qazancı dolanışığına güclə yetən kasıblar. Zəkatı verərkən durumu daha çətin olan şəxsləri ön plana salmağa diqqət etmək lazımdır.

2) Fitrə zəkatını toplayan və yoxsullara paylayan şəxslər. Lakin bu məsələdə xüsusilə diqqətli olmaq lazımdır. Yığılan pulları kasıblara ziyafət vermək, məscid tikdirmək, yol çəkmək kimi ümumi

xeyriyyə işlərinə sərf edən qurum və şəxslərə fitrə zəkatı vermək olmaz. Çünki bu xeyriyyə işləri pulu yoxsulun ixtiyarına keçirmir.

3) Pulu qurtardığı üçün yolda qalan və səfərini başa çatdırması üçün pul tapmayan yolçular.

**Fitrə zəkatı kimlərə verilməz?** Aşağıda qeyd edəcəyimiz siniflərə fitrə zəkatı verilməz:

1) Əsli ehtiyaclara və nisaba sahib olan şəxslərə. Yə'ni fitrə zəkatı ödəmək kimə vacibdirsə o şəxslərin özünə fitrə zəkatı verilməz. Çünki onlar yoxsul sayılmır. Onlara fitrə zəkatı vermək keçərli deyil.

2) Pulu yol çəkmək, yoxsullara və yetimlərə ziyafət vermək, məscid tikdirmək və s. kimi ümumi xeyriyyə işlərinə sərf edən qurum və şəxslərə. Onlara verilən fitrə zəkatı da keçərli deyil. Çünki fitrə zəkatı verərkən pulu yoxsulun birbaşa ixtiyarına keçirmək lazımdır. Ümumi xeyriyyə fəaliyyətlərində isə belə bir şey baş vermir.

3) Ərə, xanıma, ata-anaya, nənə-babaya, övlad və nəvələrə. Çünki möhtac olduqları zaman onlara baxmaq onsuz da zəruridir. Fitrə zəkatı isə zəruri borcdan əlavə bir şeydir. Digər yoxsul qohum-əqrəbaya isə verilə bilər.

4) Həqiqi seyyidlərə. Seyyidlər Peyğəmbərin (ona Allahın salamı olsun) soyundan olan şəxslərdir. Peyğəmbərimiz isə öz soyuna zəkat almağı yasaqlamışdır.

5) Başqa dindən olanlara. Müsəlman olmayanlara da fitrə zəkatı verilməz. Çünki zəkat müsəlmanların bir-biri ilə bayram münasibətilə yardımlaşmasıdır. Bayram isə müsəlmanlara xasdır.

**Fitrə zəkatı kimlərin yerinə verilər?** Fitrə zəkatı verəcək şəxs həm öz yerinə, həm də həddi-büluğa çatmayan uşaqlarının yerinə fitrə zəkatı çıxarmalıdır. Əgər üç uşağı olarsa, özünü də hesaba qataraq dörd nəfərin yerinə zəkat çıxarması vacibdir. Xanımının, böyük övladlarının, ata-anasının və digər qohum-əqrəbalarının yerinə çıxarması isə vacib deyil.

## Bayram Namazı

Bayram namazı ramazan ayı çıxdıqdan sonra qılınan iki rükətlik vacib namazdır. Vaxtı sübh namazı çıxdıqdan təqribən yarım saat sonradır.

**Bayram namazı kimlərə vacibdir?** Bayram namazı bu beş şərti özündə cəm edən hər kəsə vacibdir:

1) Həddi-büluğa çatıb ağlı başında olmaq. Uşaqlara bayram namazı qılmaq vacib deyil.

2) Kişi olmaq. Qadınlara vacib deyil.

3) Sağlam olmaq. Xəstəyə, yeriyə bilməyənə, gözü görməyənə və həddən artıq yaşlı insanlara bayram namazı qılmaq vacib deyil.

4) Şəhər sakini olmaq. Kənddə olanlara vacib deyil. Həmçinin bir şəhərdə səfərdə olan və 15 gündən az qalmağa niyyət edən kəslərə də vacib deyil.

5) Əminamanlıqda olmaq. Canına və yaxud malına təhlükə gələcəyinə ehtimal verən kəslərə bayram namazına getmək vacib deyil.

Bu beş şərti özündə cəm etməyən şəxslərə, yə’ni qadın, uşaq, xəstə, kənd sakini və səfərdə olanlara bayram namazı vacib olmasa da, bu şəxslər bayram namazını qılarlarsa namazları keçərlidir.

Bayram namazının səhih olması üçün onun şəhərdə, camaatla (imamdan başqa ən az üç nəfər) və ümumi giriş izni olan yerdə qılınması lazımdır. Kəndlərdə, yaxud tək başına və ya məhdud giriş izni olan yerlərdə (kiminsə evində və s.) qılmaq isə keçərli deyil.

**Bayram namazının qılınış şəkli.** Bayram namazı camaatla qılınar. İmam və camaat bayram namazına niyyət etdikdən sonra təkbir gətirərlər. Bundan sonra «Subhənəkə» duası oxunar. Daha sonra imam əllərini qulaq səviyyəsinə qədər qaldıraraq təkbir gətirdikdən sonra təkrar bağlamadan yanına salar. Camaat da səssiz şəkildə təkbir gətirərək eyni şeyi təkrarlar. Bu şey üç dəfə təkrarlandıqdan sonra əllər bağlanar, daha sonra Fatihə surəsi və başqa bir surə oxunaraq adi şəkildə birinci rükət bitirilər.

İkinci rükətə qalxdıqda rükuya qədər hər şey digər namazlardakı kimi davam edər. Rükuya getmədən öncə isə eynilə birinci rükətdə olduğu kimi yenə əllər qaldırılaraq üç dəfə təkbir gətirilər. Daha sonra dördüncü təkbir gətirilərək rükuya gedilər və namaz adi şəkildə tamamlanar. Bu əlavə təkbirlərə «zəvaid təkbirləri» deyilir.

Bayram namazından sonra imam xütbə verir. Bu zaman tələsik bayıra çıxmamaq, xütbəni sona qədər dinləmək, xütbədən sonra oraya gələn müsəlmanların bayramnı təbrik etmək lazımdır.

Bu əmələ riayət edərək bayram abu-havasını pozmamağa xüsusilə diqqət etmək gərək.

**Suallar və tapşırıqlar:**

1) Təravih namazının hökmü nədir?
2) Təravih namazı neçə rükətdir?
3) Təravih namazını qılarkən neçə rükətdən bir salam verilir?
4) Təravih namazının neçə rükətindən sonra dincəlmə oturuşu edilir? Bu dincəlmənin nə qədər olması müstəhəbdir?
5) Təravih namazının qəzası varmı?
6) E'tikafın səhih olması üçün hansı şərtlər lazımdır?
7) Fitrə zəkatı kimlərə vacibdir?
8) Əsli ehtiyaclar nədir?
9) Nisab nədir?
10) Fitrə zəkatının minimal miqdarı nədir?
11) Nəyə görə fitrə zəkatını bayram namazından öncə vermək daha gözəldir?
12) Nəyə görə fitrə zəkatını pulla vermək daha gözəldir?
13) Bu şəxslərdən hansılara fitrə zəkatı verilməz? (yoxsullar, seyyidlər, qardaş, bacı, ana, ümumi xeyriyyə işləri görən qurumlar, borc sahibləri)
14) Zəvaid təkbirlər nədir?
15) Bayram namazının xütbəsi namazdan əvvəldir yoxsa sonra?
16) Səhvləri tap:
   a) Təravih namazı iyirmi rükətdir.
   b) E'tikafdan səhər-səhər təmiz hava almaq üçün gəzinti məqsədilə çıxmaq olar.
   c) Fitrə zəkatını məscid tikdirmək, yol çəkmək və ziyafət vermək kimi ümumi xeyriyyə işləri görən qurumlara vermək olar.
   ç) Bayram namazı qadınlara vacib deyil, lakin qadınlar da qılarsa keçərlidir.
   e) Bayram namazı qadınlara da vacibdir.

## ORUC TUTULMASI YASAQ OLAN GÜNLƏR

İl ərzində beş gündə oruc tutmaq yasaq və günahdır. Bu günlərdən ikisi Ramazan və Qurban bayramı günləri, üçü isə Qurban bayramından sonrakı «təşriq günləri» adlanan üç gündür. Allahın Elçisi (ona Allahın salamı olsun) bu günlərdə oruc tutmağı qadağan etmişdir.

Üstəlik bayram günləri insanların yeyib-içdiyi, əyləndiyi günlər olduğundan bu günlərdə oruc tutmaq məntiqlə də üst-üstə düşmür. Heyvan kəsimi, paylaşdırılması və Qurban ətlərinin yeyildiyi günlər olan «təşriq günləri» haqda da eyni şeyi demək olar.

Ramazan ayında riayət edilməli olan bə'zi ədəb qaydaları var. Bu ədəb qaydaları təkcə ramazan ayına xas olmasa da ramazan ayında bunlara diqqət etmək xüsusilə vacibidir. Bu ədəb qaydalarından bə'ziləri aşağıdakılardır:

1) Oruc tutan şəxsin qeybətdən, mübahisədən, boş şeylərdən, bir sözlə günahlardan çəkinməsi. Allahın Elçisi (ona Allahın salamı olsun) belə buyurur: *«Kim oruc tutduğu halda yalanı tərk etməzsə qoy bilsin ki, Allahın onun yeməyi və içməyi tərk etməsinə ehtiyacı yoxdur.»*

2) Çoxlu Qur'ani-Kərim oxumaq və ayələr üzərində təfəkkür edib düşünmək. Ramazan ayı Qur'an ayıdır. Allah-Təala Qur'ani-Kərimdə bu aydan: *«Qur'anın insanlara hidayət, doğru yola və nura aparan bir kitab olaraq nazil edildiyi ramazan ayı»* [əl-Bəqərə surəsi: 185]- deyə bəhs edir. Bu səbəbdən bu ayda Qur'ani-Kərimi başdan sona qədər oxumaq sünnətdir. Peyğəmbərimizin (ona Allahın salamı olsun) səhabələrindən İbn Abbas belə deyir: *«Cəbrayıl mələk ramazan ayının hər gecəsi Peyğəmbərlə görüşər və bir yerdə Qur'ani-Kərim ayələrinə dalardılar.»*

3) Sədəqələri çoxaltmaq. İbn Abbas deyir: *«Allahın elçisi (ona Allahın salamı olsun) insanların ən comərdi idi. Ramazan ayında, Cəbrayıl mələklə görüşdüyü vaxtlar isə daha da comərd olurdu. Cəbrayıl ramazan ayının hər gecəsi onunla görüşər və bir yerdə Qur'ani-Kərim ayələrinə dalardılar. Allahın Elçisi (ona Allahın salamı olsun) küləkdən daha comərd idi.»*

4) Oruc tutan mö'min dost-tanışa, qohum-əqrəbaya, xüsusilə kasıb mö'minlərə iftar vermək. Peyğəmbərimiz (ona Allahın salamı olsun) belə buyurur: *«Kim bir oruc tutan şəxsi iftarda doyurarsa ona da o şəxsin savabı verilər, üstəlik oruc tutanın savabından heç nə azalmaz.»*

5) Pis xasiyyətləri, günahları tərk etmək və çoxlu tövbə etmək. Hər bir mö'min bu aydan olduqca səmərəli istifadə etməli və bu aydan təmiz çıxmağı özü üçün hədəf etməlidir. Bir hədisdə Cəbrayıl mələk Peyğəmbərimizə (hər ikisinə Allahın salamı olsun) belə deyir: *«Ramazan ayını başa vurduğu halda günahları bağışlanmayan (bunun üçün lazım olduğu qədər çalışmayan) kəsin üzü gülməsin.»*

Əziz oxucu, ümid edirik ki, bu kitab oruc fiqhini sənin üçün asanlaşdırdı. Sənin kimi İslamı yeni öyrənən başqa mö’min qardaş və bacılarını da bu kitabdan xəbərdar etməyi unutma. Peyğəmbərimiz (ona Allahın salamı olsun) belə buyurur: *«Fiqhi insanlara çatdıran nə çox insan var ki, çatdırdığı kəslər ondan daha çox başa düşər, daha çox faydalanarlar.»*

MÜNDƏRİCAT